*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 66-72 (2015)*

# Ağstafa Rayonu Ərazisində Hörümçəklərinin (*Arachnida, Araneae*) Öyrənilməsinə Dair

**Ş.İ. Xasayeva*, E.F. Hüseynov**

*AMEA Zoologiya İnstitutu, A.Abasov küç., 1128 döngə, 504 məhəllə, Bakı AZ1073, Azərbaycan;*
**E-mail: Shafa_Xasayeva@mail.ru, Apsheron@list.ru*

**Məqalədə 2012-2014-cü illərdə Ağstafa rayonu ərazisində aparılmış tədqiqatların nəticələri verilmişdir. Toplanılmış araxnoloji nümunələrin tədqiqi zamanı 11 fəsiləyə aid 24 növ hörümçək aşkar edilmişdir. Bunlardan iki növ (*Clubiona frutetorum*, L.Koch, 1867; *Monaeses israeliensis* Levy, 1973) Qafqaz faunası üçün, 8 cins (*Arctosa* C.L. Koch, 1847; *Parasteatoda* Archer, 1946; *Pachygnatha* Sundevall, 1823; *Enoplognatha* Pavesi, 1880; *Crustulina* Menge, 1868; *Asagena* Sundevall, 1833; *Heriaeus* Simon, 1875; *Tmarus* Simon, 1875) və 13 növ [*Neriene clathrata* (Sundevall, 1830); *Philodromus dispar* (Walckenaer, 1826); *Thanatus imbecillus* L. Koch, 1878; *Pholcus phalangioides* (Fuesslin, 1775; *Arctosa tbilisiensis* Mcheidze, 1946; *Pardosa agrestis* (Westring, 1861); *Crustulina sticta* (O. P.-Cambridge, 1861); *Pachygnatha degeeri* Sundevall, 1830; *Parasteatoda lunata* (Clerck, 1757); *Enoplognatha quadripunctata* (Simon, 1884 ); *Asagena phalerata* (Panzer, 1801); *Heriaeus* sp.; *Tmarus horvathi* Kulczynski, 1895] isə Gəncə-Qazax bölgəsi üçün ilk dəfə qeyd olunur.**

***Açar sözlər:*** *Hörümçək, Gəncə-Qazax bölgəsi, fauna, yeni növlər*

## GİRİŞ

Gəncə-Qazax bölgəsinə daxil olan Ağstafa rayonu Respublikanın şimal-qərb hissəsində, Böyük Qafqazın ətəkləri, Kiçik Qafqazla Qabırrı yaylası arasında, Gəncə-Qazax maili düzənliyində və Ceyrançöl öndağlığında yerləşir. Səthi əsasən düzənlikdir (Gəncə, Qazax və Qarayazı düzləri). Cənub-qərb, şimal və şimal-şərq hissələri (Yaylacıq silsiləsi, Çobandağ silsiləsi) alçaq dağlıqdır. Şərq hissəsi Ceyrançöl düzüdür. Ən yüksək zirvəsi 1038 m olub rayonun cənub hissəsindədir. Öz başlanğıclarını Kiçik Qafqaz dağlarından götürən Ağstafa və Həsənsu çaylarının aşağı axınları və həmçinin Kür çayı rayonun ərazisindən keçir. İqlimi mülayim isti, quru subtropikdir. Qışı quraq keçir. Əsasən dağ şabalıdı, dağ boz-qəhvəyi, şabalıdı, açıq şabalıdı dağ-meşə torpaqları yayılmışdır. Yovşanlı-şoranotlu yarımsəhra və çöl bitkiləri, Kür çayı sahilində Tuqay meşələri vardır (Məmmədov, 2007) .

Gəncə-Qazax bölgəsinin hörümçəklərinin öyrənilmə tarixinə nəzər saldıqda aydın oldu ki, indiyə qədər bölgədə müntəzəm olaraq geniş elmi tədqiqat işi aparılmamışdır və müxtəlif müəlliflər tərəfindən 21 fəsiləyə aid 85 hörümçək növü qeyd edilmişdir (Schmidt, 1895; Харитонов, 1936). Bunlardan 4 fəsiləyə *(Theridiidae, Zodariidae, Thomisidae, Oxyopidae)* aid 5 növ (*Theridion impressum*, *Oxyopes heterophtalmus*, *Oxyopes lineatus, Zodarion thoni, Thomisus albus, Thomisus onustus)* Kulczysky tərəfindən Ağstafada qeyd olunub (Kulczynsky, 1895).

## MATERİAL VƏ METODLAR

Material 2012-2014-cü illərdə Ağstafa rayonunun ətraf kənd və qəsəbələrinin ərazisindən toplanmışdır. 100-ə yaxın araxnoloji nümunə götürülmüşdür. Tədqiqat zamanı materialın yığılması ümumi qəbul olunmuş metodika ilə - vizual axtarma və əl (manual) ilə toplama yolu ilə aparılmışdır. Hörümçəklər yaşaya bilən bütün yerlər diqqətlə nəzərdən keçirilmişdir. Bundan başqa nümunələrin toplanmasında çətir, entomoloji tor, eksqauster, tələlərdən, botrobiont hörümçəklərin yuvalardan çıxarılması və s. üsullardan istifadə olunmuşdur. Bütün tapılan materiallar 75%-li etil spirtində fiksasiya edilib, etiketlənmişdir. Materialın təyin edilməsi NİKON SMZ 1270 mikroskopu vasitəsilə yetkin fərdlər üzrə aparılmışdır. Növlərin təyin olunması sistematikası əsasən Avropanın hörümçəklər faunası vasitəsilə, dünyada yayılması isə Platnikin dünyanın hörümçəkləri kataloquna əsaslanaraq verilmişdir (http://www.araneae.unibe.ch; http://research.amnh.org/iz/spiders/catalog_15.0/index.html).

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

2012-ci ildən başlayaraq Ağstafa rayonu ərazisində tədqiqat işləri aparırıq. Rayonun ətraf kənd və qəsəbələrinin ərazisindən topladığımız araxnoloji materialların tədqiqi zamanı 11 fəsiləyə aid 24 növ hörümçək aşkar edilmişdir. Bunlardan iki növ *(Clubiona frutetorum,* L.Koch, *1867; Monaeses israeliensis Levy, 1973)* isə Qafqaz faunası üçün, 8 cins *(Arctosa* C.L.Koch, 1847; *Parasteatoda* Archer,

1946; *Pachygnatha* Sundevall, 1823; *Enoplognatha* Pavesi, 1880; Crustulina Menge, 1868; *Asagena* Sundevall, 1833; *Heriaeus* Simon, 1875; *Tmarus* Simon, 1875*) və 13 növ [Neriene clathrata* (Sundevall, 1830); *Philodromus dispar (*Walckenaer, 1826); *Thanatus imbecillus* L. Koch, 1878; *Pholcus phalangioides* (Fuesslin, 1775; *Arctosa tbilisiensis* Mcheidze, 1946; *Pardosa agrestis* (Westring, 1861); *Crustulina sticta* (O. P.-Cambridge, 1861); *Pachygnatha degeeri* Sundevall, 1830; *Parasteatoda lunata* (Clerck, 1757); *Enoplognatha quadripunctata* (Simon, 1884); *Asagena phalerata* (Panzer, 1801); *Heriaeus* sp.; *Tmarus horvathi* Kulczynski, 1895*] isə Gəncə-Qazax bölgəsi üçün ilk dəfə qeyd olunur.*

**Həmin növlər aşağıdakılardır:**

**Fəsilə: Araneidae Simon, 1895**
**Cins: *Mangora* O. P.-Cambridge, 1889**
**Növ: *Mangora acalypha* (Walckenaer, 1802)**
**Material:** 2♀♀,1 juv., Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya; 1♂, Ağstafa, S.Vurğun qəsəbəsi, 09.05.2013, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Qusar, Gəncə, Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə, Lənkəran təbii vilayətində, İsmayıllıda və Şərurda qeyd olunub. (Вержбицкий, 1902; Харитонов, 1936; Дунин, 1984; Дунин, 1989; Мамедов, 1992; Guseinov, 1999; Hüseynov və b., 2003; Marusik et al., 2004).
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Dişilər 3.5-4 mm, erkəklər 2.5-3 mm uzunluğunda olurlar. İsti ərazilərdə qısa bitkilərin, otların üzərində tapılır. Hər iki cinsin yetkin fərdlərinə may-iyun aylarında rast gəlinir.

**Fəsilə: Clubionidae Wagner, 1887**
**Cins: *Clubiona* Latreille, 1804**
**Növ: Clubiona *frutetorum*, L.Koch, 1867**
**Material:** 1♂, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Qafqaz faunası üçün yeni növdür.
**Dünyada yayılması:** Avropadan Mərkəzi Asiyaya qədər yayılıb.
**Qeyd:** Bu növə çəmənliklərdə, kolluqlarda, şitillərin və qısa boylu bitkilərin arasında rast gəlinir. Erkək fərdin bədəni 4-7 mm uzunluğunda olur.

**Fəsilə: Linyphiidae Blackwall, 1859**
**Cins: *Neriene* Blackwall, 1833**
**Növ: *Neriene clathrata* (Sundevall, 1830)**
**Material:** 2♂♂, Ağstafa, 28.04.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Xaçmaz, Şamaxı, Lənkəran və Muğan düzündə qeyd olunub (Tanasevitch, 1987; Дунин, Мамедов, 1992). Gəncə-Qazax bölgəsi üçün yeni növdür.
**Dünyada yayılması:** Bu növ açıq, geniş ərazilərdə, otların, kolların arasında, bataqlıqlarda, meşədə, bağlarda alçaq boylu bitkilərin üzərində yaşayır. Hər iki cinsin yetkin fərdlərinə il boyu hər yerdə rast gəlmək olur. Lakin, yaz, yay və payızda daha çox tapılır. Dişilərin bədəni 3,0-5,5 mm, erkəklərinki isə 3,6-4,8 mm uzunluqda olur.
**Qeyd:** Holarktik növdür.
**Fəsilə: Philodromidae Thorell, 1870**
**Cins: *Philodromus* Walckenaer, 1826**
**Növ: *Philodromus dispar (*Walckenaer, 1826)**
**Material:** 1♀, Ağstafa, 19.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Böyük Qafqazın cənub hissəsində, Lənkəran təbii vilayətində və Şahbuzda qeyd olunub (Дунин,1989; Guseinov, 1999; Marusik et al., 2004). Gəncə-Qazax bölgəsi üçün yeni növdür.
**Dünyada yayılması:** Avropadan Mərkəzi Asiyaya qədər yayılıb.
**Qeyd:** Dişilərin bədəni 4-5 mm uzunluğunda, tünd qəhvəyi və ya qara rənglidir. Erkəklərinki isə parıltılıdır, ölçüsü 7-8 mm-dir. Əsasən ağac və kolların üzərində rast gəlinən bu növ tor toxumur, qidasını aktiv şəkildə ovlayır.

**Cins: *Thanatus* C. L. Koch, 1837**
**Növ: *Thanatus imbecillus* L. Koch, 1878**
**Material:** 1♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Abşeron yarımadasında, Muğan düzündə, Lənkəran təbii vilayətində, Şərur və Şahbuzda qeyd olunub (Дунин, 1984; Дунин, Мамедов, 1992; Guseinov, 1999; Hüseynov və b., 2003; Marusik et al., 2004). Gəncə-Qazax bölgəsi üçün yeni növdür.
**Dünyada yayılması:** Bolqariyadan Mərkəzi Asiyaya qədər yayılıb.
**Qeyd:** Bu növ quru və qumlu ərazilərdə,daşların altında, torpağın səthində, sıx və ya seyrək bitkilərin arasında tapılır. Bədəni boz rənglidir və 7 mm uzunluğundadır. Yetkin fərd erkən yazdan aprelin axırınadək rast gəlmək olur. Bu növ tor qurmur. Öz qidasını pusquda duraraq aktiv şəkildə ovlayır. Əsasən arılarla, kəpənəklərlə, ağcaqanad, böcək və digər buğumayaqlılarla qidalanır.

**Cins: *Tibellus* Simon, 1875**
**Növ: *Tibellus oblongus* (Walckenaer, 1802)**
**Material:** 2♂♂, 1♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya;
**Azərbaycanda yayılması:** Gəncədə, Şəki-Zaqatala bölgəsində, Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə və Lənkəran təbii vilayətində qeyd olunub (Харитонов, 1936; Атакишиев, 1969; Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999).
**Dünyada yayılması:** Holarktik növdür.

**Qeyd:** Bu növə müxtəlif ərazilərdə rast gəlinir: quru və ya nəmli otların arasında, günəşli yerlərdə, qumların arasında, bitkilərin üzərində və s. Bədəni açıq və ya tünd sarı rəngdə olur. Erkəklər 5-7.5 mm, dişilər 6.5-11.5 mm uzunluqda olur.

**Fəsilə: Pholcidae C. L. Koch, 1851**
**Cins: *Pholcus* Walckenaer, 1805**
**Növ: *Pholcus phalangioides* (Fuesslin, 1775)**
**Material:** 1♂, 1♀, Ağstafa, 12.12.2013, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Şəki-Zaqatala bölgəsində, Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində və Lənkəran təbii vilayətində qeyd olunub.Gəncə-Qazax bölgəsi üçün yeni növdür. (Атакишиев, 1969; Дунин, 1984; Дунин, 1989; Guseinov, 1999).
**Dünyada yayılması:** Kosmopolit növdür.
**Qeyd:** Nazik və uzun ayaqları ilə diqqəti cəlb edən bu növ isti və rütubətli binalarda, anbarlarda, divarların küncündə dağınıq şəkildə tor qurur və öz torunda tərs şəkildə oturaraq ovunu gözləyir. O toru vasitəsilə öz ölçüsündən böyük böcək və digər onurğasızları ovlayır. Tora toxunduqda hörümçək və tor şiddətli titrəyir. Erkəklər 7-10 mm, dişilər 7-8 mm uzunluqda olur.

**Fəsilə: Oxyopidae Thorell, 1870**
**Cins: *Oxyopes* Latreille, 1804**
**Növ: *Oxyopes heterophtalmus* (Latreille, 1804)**
**Material:** 10♂♂, 12♀♀, Ağstafa, Poylu kəndi, 19.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Ağstafa, Qusar, Gəncə, Abşeron yarımadası, Lənkəran təbii vilayəti və İsmayıllıda qeyd olunub (Kulczynsky, 1895; Вержбицкий, 1902; Харитонов, 1936, Дунин, 1984; Guseinov, 1999; Hüseynov və b., 2003)..
**Dünyada yayılması:** Paleraktik növdür.
**Qeyd:** Bu növə quru otların və bitkilərin arasında rast gəlinir. Bitkilərin arasında gəzərək öz qidasını ovlayır. Bədəni tünd qəhvəyi rəngdədir. Ayaqları qaradır, üzərində açıq rəngli tüklər və tikancıklar var. Uzunluğu 5-7 mm olur.

**Növ: *Oxyopes lineatus* (Latreille, 1806)**
**Material:** 1 juv., Ağstafa, Poylu kəndi, 19.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Ağstafa, Naxçıvan, Qusar, Abşeron yarımadası, Böyük Qafqazın cənub hissəsi, Muğan düzü, Lənkəran təbii vilayəti və İsmayıllıda qeyd olunub (Kulczynsky, 1895; Schmidt, 1895 Вержбицкий, 1902; Дунин, 1984; Дунин,1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999; Hüseynov və b., 2003).
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Meşələrdə, otlaqlarda, düzlərdə alçaq bitkilərin üzərində rast gəlinir. Gün ərzində aktiv olur, xüsusilə də günəşli günlərdə yarpaq və otların arasında fəal hərəkət edir. Bu öv öz qidasını toru ilə ovlamır. O pusquda duraraq həşərat və digər kiçik onurğasız heyvanları gözləyir. Onun görmə qabiliyyəti çox yaxşı olmasa da öz qidasını 10 sm məsafədən aşkar edir. Ovunu tapan kimi uzun ayaqları ilə sürətlə qaçaraq onun üzərinə tullanır və zəhərli dişləri (xeliser) ilə onu sancıb iflic edərək öldürür. Onun zəhəri iri heyvanlar və insan üçün təhlükəli deyil. Dişilər 6-6.5 mm, erkəklər 4-5 mm uzunluğunda olur.

**Fəsilə: Lycosidae Sundevall, 1833**
**Cins: *Arctosa* C. L. Koch, 1847**
**Növ: *Arctosa tbilisiensis* Mcheidze, 1946**
**Material:** 2♀♀, Ağstafa, Tatlı kəndi, 29.04.2014, Ş.Xasayeva; 2♀♀, Ağstafa, 09.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə, Lənkəran təbii vilayətində, İsmayıllıda və Şərurda qeyd olunub (Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999; Hüseynov və b., 2003; Marusik et al., 2004). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Bolqarıstan, Yunanıstan və Gürcüstanda yayılıb.
**Qeyd:** Erkəklərin bədəni 3.92-4.34 mm, dişilərinki isə 6.35-6.68 mm uzunluğunda olur. İlin bütün fəsillərində rast gəlinir.

**Cins: *Pardosa* C.L.Koch, 1847**
**Növ: *Pardosa agrestis* (Westring, 1861)**
**Material:** 1♂, Ağstafa, Aşağı Kəsəmən kəndi. 09.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə və Lənkəran təbii vilayətində qeyd olunub (Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999). Gəncə-Qazax bölgəsi üçün yeni növdür.
**Dünyada yayılması:** Palearktik novdür.
**Qeyd:** Bu növə müxtəlif ərazilərdə, açıq, quru sahələrdə, qayalıqlarda, meşələrdə, dağlarda,seyrək bitkilərin arasında, gilli torpaqlarda, sahilə yaxın ərazilərdə, bəzən rütubətli və ya bataqlıq ərazilərdə rast gəlinir. Dişilər 6-9 mm, erkəklər 4.5-7 mm uzunluğunda olur.

**Cins: *Trochosa* C. L. Koch, 1847**
**Növ: *Trochosa ruricola* (De Geer, 1778)**
**Material:** 1 ♂, Ağstafa, Köçəsgər kəndi, 04.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Gəncədə, Böyük Qafqazın cənub hissəsində və Lənkəran təbii vilayətində qeyd olunub (Харитонов, 1936; Дунин, 1989; Guseinov, 1999).

**Dünyada yayılması:** Holarktik növdür.
**Qeyd:** Növə daşların, qayaların və sıx bitkilərin altında rast gəlinir. Hər iki cinsin yetkin fərdlərini mart ayından dekabra qədər tapmaq olur. Erkəklərin bədəni 7-9.5 mm, dişilərinki isə 8-14 mm uzunluğunda olur.

**Fəsilə: Tetragnathidae Menge, 1866**
**Cins: *Pachygnatha* Sundevall, 1823**
**Növ: *Pachygnatha degeeri* Sundevall, 1830**
**Material:** 1 ♂, Ağstafa, S.Vurğun qəsəbəsi, 05.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə, Lənkəran təbii vilayətində və Şahbuzda qeyd olunub (Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999; Marusik et al., 2004). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Bu növ meşələrdə, otların və digər bitkilərin arasında yaşayır.Yetkin fərdlərə yayın ortasından qışın birinci yarısına qədər rast gəlinir. Erkəklər 2-4 mm, dişilər 2-4.5 mm uzunluqda olur.

**Fəsilə: Theridiidae Sundevall, 1833**
**Cins: *Enoplognatha* Pavesi, 1880**
**Növ: *Enoplognatha quadripunctata* (Simon, 1884)**
**Material:** 1♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Şərur, Abşeron, Xızı, Qobustan, Qusar, Lerik, Lənkəran və Siyəzəndə qeyd olunub (Huseynov, Marusik, 2008; Hüseynov və b., 2003). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Aralıq dənizindən Azərbaycana qədər yayılıb.
**Qeyd:** Adətən quru ərazilərdə yaşayır. Daşların altında, meşələrdə, quru kolların arasında, daşlı dağ yamaclarında, qumların arasında rast gəlinir. Dişilərin bədəni 2.2-4.1 mm, erkəklərinki isə 1.8-3.8 mm uzunluğunda olur.

**Cins: Crustulina Menge, 1868**
**Növ: *Crustulina sticta* (O. P.-Cambridge, 1861)**
**Material:** 2♀♀, Ağstafa, 30.04.2014, Ş.Xasayeva
**Azərbaycanda yayılması:** Muğan düzündə qeyd olunub (Дунин, Мамедов, 1992).Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Holarktik növdür.
**Qeyd:** Bu növ rütubətli, isti çöllərdə, daşların arasında, rütubətli qumluqlarda, bataqlıqlarda yayılıb. Hər iki cinsin yetkin fərdlərinə may-iyun aylarında rast gəlinir. Dişilərə hətta oktaybra qədər rast gəlmək olar. Dişilərin bədəni 2.8-3.5 mm, erkəklərinki isə 2.5 mm uzunluğunda olur.

**Cins: *Parasteatoda* Archer, 1946**
**Növ: *Parasteatoda lunata* (Clerck, 1757)**
**Material:** 1♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Qusar, Şəki-Zaqatala bölgəsi, Böyük Qafqazın cənub hissəsi və Lənkəran təbii vilayətində qeyd olunub (Вержбицкий, 1902; Атакишиев, 1969; Дунин, 1989; Guseinov, 1999). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Əsasən kölgəli və gizli yerlərdə, ağac və kolların budaqları arasında rast gəlinir. Dişilərin bədəni 2.7-5.6 mm, erkəklərinki isə 2.7-5 mm uzunluğunda olur.

**Cins: *Asagena* Sundevall, 1833**
**Növ: *Asagena phalerata* (Panzer, 1801)**
**Material:** 4♂♂, Ağstafa, Dağ Kəsəmən kəndi, 09.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Lənkəran təbii vilayətində və İsmayıllıda qeyd olunub (Дунин, 1984; Дунин, 1989; Guseinov, 1999; Hüseynov və b., 2003). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Bu növ isti və quru ərazilərdə torpağın üzərində və ya alçaq boylu bitkilərin üzərində, qumların arasında tapılır. Yetkin erkəklərə may-sentyabr aylarında, dişilərə isə hətta oktyabr ayında rast gəlinir. Xarici görünüşünə görə qarışqaya oxşayır və adətən qarışqalarla birgə, bəzən isə qarışqa yuvalarında rast gəlinir. Tor qurmur. Lakin, qarışqaları fəal şəkildə ovlayır. Dişilərin bədəni 4.5-5.7 mm, erkəklərinki isə 4.5-5 mm uzunluğunda olur.

**Fəsilə: Thomisidae Sundevall, 1833**
**Cins: *Heriaeus* Simon, 1875**
**Növ: *Heriaeus* sp.**
**Material:** 1sub ♂, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Cinsin 3 növü Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə və Lənkəran təbii vilayətində qeyd olunub (Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Cinsə daxil olan 25 növ Afrika, Avropa və Asiyada yayılmışdır.
**Qeyd:** Xarici görünüşləri xərçəngi xatirlatdığına görə bu cinsin nümayəndələrinə xərçəng hörümçəklər də deyirlər. Bu hörümçəklərdə I-II yerimə ayaqları əvvəlcə yana, sonra isə önə doğru uzanmışdır və III-IV cüt yerimə ayaqlarından daha uzundurlar. Pusquda duraraq öz qidalarını ovlayırlar. Yaşadıqları yerin rənginə uyğunlaşdıqları üçün növlər müxtəlif rəngdədirlər. Növlərin əksəriyyəti çiçəkli bitkilərin üzərində yaşayır.

**Cins: *Monaeses* Thorell, 1869**
**Növ: *Monaeses israeliensis* Levy, 1973**
**Material:** 1♂, 1♀, Ağstafa, 05.05.2014, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Qafqaz faunası üçün yeni növdür.
**Dünyada yayılması:** Yunanıstan, Türkiyə, İzrail, Mərkəzi Asiya.
**Qeyd:** Sıx otların, alçaq boylu kənd təsərrüfatı bitkilərinin arasında rast gəlinir. Bu növ tor qurmur. Qidasını bitkilərin budaqları arasında pusquda durmaqla tutur. Erkəklər 6-7 mm, dişilər 8-9 mm uzunluqda olur.

**Cins: *Synema* Simon, 1864**
**Növ: *Synema globosum* (Fabricius, 1775)**
**Material:** 2♂♂, Ağstafa, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Qusar, Gəncə, Böyük Qafqazın cənub hissəsi, Lənkəran təbii vilayəti və İsmayıllıda qeyd olunub (Вержбицкий, 1902; Харитонов, 1936; Дунин, 1989; Guseinov, 1999; Hüseynov və b., 2003).
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Bu növə alçaq boylu bitkilərin, kolların budaqları üzərində, otların arasında rast gəlinir. Tor qurmur, öz qidasını pusquda duraraq ovlayır. Dişi 6-8 mm, erkək 3-4 mm uzunluğunda olur.

**Cins: *Thomisus* Walckenaer, 1805**
**Növ: *Thomisus onustus* Walckenaer, 1805**
**Material:** 2♂♂, 3♀♀, Ağstafa, Poylu kəndi, 19.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Lənkəran təbii vilayətində, Ağstafada, Qusarda, Gəncədə, Abşeron yarımadasında, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə, İsmayıllıda və Şərurda qeyd olunub (Koch, 1878; Kulczynsky, 1895; Вержбицкий, 1902; Харитонов, 1936; Дунин, 1984; Дунин, 1989; Дунин, Мамедов, 1992; Hüseynov və b., 2003; Marusik et al., 2004).
**Dünyada yayılması:** Palearktik növdür
**Qeyd:** Növə günəş radiasiyası çox olan isti və quru ərazilərdə, meşələrdə, yamaclarda, quru otların arasında rast gəlinir. Hər iki cinsin yetkin fərdlərinə may-iyun aylarında rast gəlinir. Dişilər iyun ayında yumurta kisələrini çiçəklərin üzərinə qoyurlar. Tor qurmur. Öz qidasını çiçəklərin üzərində pusquda duraraq ovlayır. O, ovunu güclü və uzun ön ayaqları ilə tutur. Qidasını əsasən milçəklər, böcəklər, kəpənəklər, arılar təşkil edir. Bu növün rəngi çox dəyişkəndir. Bir neçə gün ərzində aktiv rəng dəyişdirmə xüsusiyyətinə malikdir. Dişi 7-9,8 mm, erkək 2-3,6 mm uzunluğunda olur.

**Cins: *Tmarus* Simon, 1875**
**Növ: *Tmarus horvathi* Kulczynski, 1895**
**Material: Material:** 1♂, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Şamaxıda qeyd olunub (Logunov, 1992). Gəncə-Qazax bölgəsi üçün yeni cinsdir.
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Növə alçaq boylu ağacların budaqlarında, kolların yarpaq və budaqları arasında, otların üzərində rast gəlinir. Bu növ tor qurmur, qidasını ovlayır. Mühitə uyğun rəngdəyişmə qabiliyyətinə malikdir. Xarici görünüşü xərçəngi xatırladır. I-II yerimə ayaqları III-IV yerimə ayaqlarından uzundur.

**Cins: *Xysticus* C. L. Koch, 1835**
**Növ: *Xysticus kochi* Thorell, 1872**
**Material:** 4♂♂, 11♀♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya; 2♂♂, 6♀♀, Ağstafa, 19.05.2013, Ş.Xasayeva.
**Azərbaycanda yayılması:** Gəncədə, Şəki-Zaqatala bölgəsində, Böyük Qafqazın cənub hissəsində, Muğan düzündə, Lənkəran təbii vilayətində, İsmayıllıda və Şahbuzda qeyd olunub (Xaritonov, 1936; Атакишиев, 1969; Дунин, 1989; Дунин, Мамедов, 1992; Guseinov, 1999; Hüseynov və b., 2003; Marusik et al., 2004).
**Dünyada yayılması:** Aralıq dənizindən Mərkəzi Asiyaya qədər və avropada yayılıb.
**Qeyd:** Müxtəlif ərazilərdə - daşların altında, torpaq üzərində, qısa boylu bitkilərin üzərində, otların arasında, bəzən açıq ərazilərdə rast gəlinir. Hər iki cinsin yetkin fərdlərinə may-iyun aylarında, dişilərə hətta payızda da rast gəlinir.Dişilərin bədəni 6-8 mm, erkəklərinki isə 4-5 mm uzunluğunda olur. Bu növ tor toxumur. Öz qidasını ağac və çiçəklərin üzərində pusquda durmaqla tutur.

**Fəsilə: Uloboridae Thorell, 1869**
**Cins: *Uloborus* Latreille, 1806**
**Növ: *Uloborus walckenaerius* (Latreille, 1806)**
**Material: Material:** 1♀, Ağstafa, Poylu kəndi, 20.05.2012, N.Sneqovaya.
**Azərbaycanda yayılması:** Gəncə, Xaçmaz, Saatlı, Lənkəran, Böyük Qafqazın cənub hissəsi, Muğan düzü, İsmayıllı və Şərurda qeyd olunub (Харитонов, 1936; Дунин, 1988; Дунин,1989; Дунин, Мамедов, 1992; Hüseynov və b., 2003; Marusik et al., 2004).
**Dünyada yayılması:** Palearktik növdür.
**Qeyd:** Bu növ isti və açıq ərazilərdə, bitkilərin arasında diametri 13-18 sm olan üfüqi tor qurur. O yumurtalarla (70-100 ədəd) dolu olan baramasını torun kənarına bərkidir. Hər iki cinsin yetkin fərdlərinə yayın sonlarında rast gəlinir.Dişilərin bədəni 6-8 mm, erkəklərinki isə 4-5 mm uzunluqda olur. Bu fəsiləyə daxil olan növlərdə zəhər vəziləri olmur.Ona görə bu növ öz ovunu parçalayarq qidalanır.

## NƏTİCƏLƏR

1) Araxnoloji nümunələrin tədqiqi zamanı 11 fəsiləyə aid 24 növ hörümçək aşkar edilmişdir.
2) 8 cins *(Arctosa* C.L.Koch, 1847; *Parasteatoda* Archer, 1946; *Pachygnatha* Sundevall, 1823; *Enoplognatha* Pavesi, 1880; Crustulina Menge, 1868; *Asagena* Sundevall, 1833; *Heriaeus* Simon, 1875; *Tmarus* Simon, 1875*)* və 13 növ *[Neriene clathrata* (Sundevall, 1830); *Philodromus dispar (*Walckenaer, 1826); *Thanatus imbecillus* L. Koch, 1878; *Pholcus phalangioides* (Fuesslin, 1775; *Arctosa tbilisiensis* Mcheidze, 1946; *Pardosa agrestis* (Westring, 1861); *Crustulina sticta* (O. P.-Cambridge, 1861); *Pachygnatha degeeri* Sundevall, 1830; *Parasteatoda lunata* (Clerck, 1757); *Enoplognatha quadripunctata* (Simon, 1884 ); *Asagena phalerata* (Panzer, 1801); *Heriaeus* sp.; *Tmarus horvathi* Kulczynski, 1895] Gəncə-Qazax bölgəsi üçün ilk dəfə qeyd olunub.
3) 2 (*Clubiona frutetorum,* L.Koch, *1867; Monaeses israeliensis* Levy, 1973) növ Qafqaz faunası üçün ilk dəfə qeyd olunub.

## ƏDƏBİYYAT

**Hüseynov E.F., Əliyev X.Ə., Sneqovaya N.Y.** (2003) İsmayıllı qoruğunun hörümçəklər faunasının öyrənilməsinə dair. *Azərbaycan Zooloqlar cəmiyyəti, I Qurultayın materialları,* Bakı: s.191-195.

**Məmmədov Q.** (2007) Azərbaycanın torpaq ehtiyatlarından səmərəli istifadənin sosial-iqtisadi və ekoloji əsaslar. Bakı: Elm, s. 222-293.

**Атакишиев Т.А**. (1969) Пауки – симбионты медоносной пчелы. *Уч. зап. Казанск. вет. ин-та.,* **105:** 317-323.

**Вержбицкий Э.** (1902) О пауках Кавказского края. *Зап. Киевск. общ. естествоисп.*, **17 (вып. 2):** с. 461-504.

**Дунин П.М.** (1984) Фауна и экология пауков (*Aranei*) Апшеронского полуострова (Азербайджанская ССР). *Фауна и экол. паукообразных,* Пермь: Пермск. ун-т., с. 45-60.

**Дунин П.М.** (1988) Пауки (*Aranei*) ) юго-восточной части Большого Кавказа (в пределах Азербайджанской ССР). Автореф. дис…. канд. биол. н. Л.:ЛГУ, 16 с.

**Дунин П.М.** (1989). Фауна и высотное распределение пауков (*Arachnida, Aranei*) Азербайджанской части южного макросклона Большого Кавказа. *Фауна и экол. пауков и скорпионов: Арахнол. сб.* М.: Наука., с. 31-39.

**Дунин П.М., Мамедов А.А.** (1992) Пауки хлопковых полей юго-восточной части Азербайджана. *Бюл. Моск. общ-ва испыт. природы, отд. биол.,* **97 (вып. 6):** 53-61

**Харитонов Д.Е.** (1936) Дополнение к каталогу русских пауков. *Уч. зап. Пермск. ун-та,* **2 (вып. 1):** 167-225.

**Guseinov E.F. (**1999) Spiders of Lenkoran natural region and Apsheron peninsula in Azerbaijan. *Autoref. of the PhD thesis,* Baku, 29 p.

**Huseynov E.F., Marusik Y.M.** (2008) Spiders (*Arachnida, Aranei*) of Azerbaijan 3. Survey of the genus *Enoplognatha* Pavesi, 1880 (*Therididae*). *Arthropoda Selecta,* **16:** 153-167.

**Logunov D.V.** (1992) A review of the spider genus *Tmarus* Simon, 1875 (*Araneae, Thomisidae*) in the USSR fauna, with a description of new species. *Siberian biol. J.,* **(1):** 61-73.

**Marusik Y.M., Guseinov E.F., Aliev H.A.** (2004) Spiders (*Arachnida : Aranei*) of Azerbaijan. 4. Fauna of Naxcivan. *Arthropoda Selecta,* **13:** 135-149.

**Tanasevitch A.V.** (1987) The linyphiid spiders of the Caucasus, USSR. *Senckenberg. biol.*, **Bd. 67 (H. 4-6):** 197-383.

**Kulczynsky A.L.** (1895) Attidae Musei Zoologici Varsoviensis in Siberia Orientali Collecti. *Dissert. Akad. Cracoviensis,* **32:** 44-98, tab. II.

**Koch L.** (1878) Kaukasische Arachnoiden. O.Schneider (ed.): *Naturwissenschaftliche Beitrage zur Kenntniss der Kaukasuslander*. Dresden, **3:** 36-71.

**Schmidt P.** (1895) Beitrag zur Kenntnis der Laufspinnen (*Araneae, Citigradae* Thor.) Russlands. *Zool. Jb., Abt. syst. Bol.,* **8 (Nr. 4):** 439-484.

**http://www.araneae.unibe.ch** (*Araneae* spiders of Europe).

**http://research.amnh.org/iz/spiders/catalog_15.0/index.html** (The World Spider Catalog, Version 15 by Norman I. Platnick).

**Изучение Пауков (*Arachnida, Araneae*) Агстафинского Района**

**Ш.И. Хасаева, Э. Ф. Гусейнов**

*Институт зоологии НАНА*

В статье приводятся результаты исследования фауны пауков Агстафинского района, проведенных в 2012-2014 гг. В результате исследований было выявлено 24 вида пауков из 11 семейств. Из них 8 родов *(Arctosa* C.L.Koch, 1847; *Parasteatoda* Archer, 1946; *Pachygnatha* Sundevall, 1823; *Enoplognatha* Pavesi, 1880; Crustulina Menge, 1868; *Asagena* Sundevall, 1833; *Heriaeus* Simon, 1875; *Tmarus* Simon, 1875*)* и 13 видов [*Neriene clathrata* (Sundevall, 1830); *Philodromus dispar (*Walckenaer, 1826); *Thanatus imbecillus* L. Koch, 1878; *Pholcus phalangioides* (Fuesslin, 1775; *Arctosa tbilisiensis* Mcheidze, 1946; *Pardosa agrestis* (Westring, 1861); *Crustulina sticta* (O.P.-Cambridge, 1861); *Pachygnatha degeeri* Sundevall, 1830; *Parasteatoda lunata* (Clerck, 1757); *Enoplognatha quadripunctata* (Simon, 1884); *Asagena phalerata* (Panzer, 1801); *Heriaeus* sp.; *Tmarus horvathi* Kulczynski, 1895] впервые указываются для фауны Гянджа-Газахской зоны. Два вида *(Clubiona frutetorum,* L.Koch, 1867; *Monaeses israeliensis* Levy, 1973) оказались новыми для фауны всего Кавказа в целом.

***Ключевые слова*: *Пауки, Гянджа-Газахская зона, фауна, новые виды***

**Study of Spiders (*Arachnida, Araneae*) in Agstafa Region**

**Sh. I. Khasayeva, E.F. Huseynov**

*Institute of Zoology, ANAS*

In the paper results of the investigation of the spider fauna in Agstafa district conducted in 2012 -2014 years are provided. During the period of the investigation 24 species of spiders belonging to 11 families were found. Eight genera *(Arctosa* C.L.Koch, 1847; *Parasteatoda* Archer, 1946; *Pachygnatha* Sundevall, 1823; *Enoplognatha* Pavesi, 1880; Crustulina Menge, 1868; *Asagena* Sundevall, 1833; *Heriaeus* Simon, 1875; *Tmarus* Simon, 1875*)* and 13 species [*Neriene clathrata* (Sundevall, 1830); *Philodromus dispar (*Walckenaer, 1826); *Thanatus imbecillus* L. Koch, 1878; *Pholcus phalangioides* (Fuesslin, 1775; *Arctosa tbilisiensis* Mcheidze, 1946; *Pardosa agrestis* (Westring, 1861); *Crustulina sticta* (O. P.-Cambridge, 1861); *Pachygnatha degeeri* Sundevall, 1830; *Parasteatoda lunata* (Clerck, 1757); *Enoplognatha quadripunctata* (Simon, 1884 ); *Asagena phalerata* (Panzer, 1801); *Heriaeus* sp.; *Tmarus horvathi* Kulczynski, 1895] are new records for the fauna of the Ganja-Gazakh zone and two species (*Clubiona frutetorum,* L.Koch, 1867; *Monaeses israeliensis* Levy, 1973) for the whole Caucasus.

***Key words*: *Spider, Ganja-Gazakh zone, fauna, new species***